# Orta əsrlər Azərbaycanında təhsil anlayışı, strukturu, metodologiyası və tədris vasitələri (X-XVI əsrlər)

**Əkbər N. Nəcəf**

**Müəllif:**
Əkbər N. Nəcəf —
Orta əsrlər ümumi Türk tarixi tədqiqatçısı.
Azərbaycan, Bakı.
E-mail:
ekbernecef@gmail.com

**Annotasiya.** Müasir yerli və xarici tarixşünaslıqda Azərbaycanın orta əsrlər təhsil tarixi ümumi halda işıqlandırılıb. Həmin çalışmalar, əsasən, tədris məkanları (mədrəsə və sufi dərgahları) və mədəniyyətin bəzi sahələrini (elm, ədəbiyyat və memarlıq) əhatə edir. Bizim məqalədə isə tədris müddəti, səviyyəsi, qaydaları, dərsliklər, kitabxanalar, dərs ilinin açılışı, tələbələrin təqaüd və müəllimlərin maaş sistemi, yetim və kimsəsiz uşaqların tərbiyəsi və təhsili haqqında bu vaxta qədər mədəniyyət tariximizdə işlənməyən mövzular tədqiq olunub. Orta əsrlərin zəngin mədəni irsi çox zaman siyasi və sosial hadisələrin işığında araşdırıldığı üçün insan həyatı ilə birbaşa bağlı məsələlər arxa planda qalmışdır. Halbuki orta əsrlərin maddi, dini, hüquqi və mənəvi mədəniyyəti əksər hallarda siyasi hadisələrin önündə gəlirdi. Orta əsr Azərbaycan hökmdarlarının bir çox hallarda alim və şair kimliyi ilə diqqət çəkməsi məhz dövrün təhsil anlayışının səviyyəsinə və əhəmiyyətinə işarədir. Mənbələr orta əsrlər Azərbaycanında içində birdən çox orta və ali təhsil ocaqlarının olduğu şəhərlərdən, böyük vəqflərdən və hətta vəqf şəhərlərindən, mədrəsələrdə dərs verən çoxsaylı alim və müdərrislərdən, böyük və məşhur kitabxanalardan, xalqın təhsil səviyyəsindən bəhs edirlər. Bu dövrdə elmin bəzi sahələrinin, xüsusilə də ədəbiyyat, siyasət elmi, tibbin geniş rəğbət gördüyünə və inkişafına şahid oluruq. Maraqlı cəhətdir ki, tədqiq edilən dövrdə mövcud olmuş dövlətlərin məmur və dövlət adamlarını, hətta hərbi kadrlarını hazırlamaq üçün xüsusi məktəbləri fəaliyyət göstərirdi. Nəticə etibarilə orta əsrlərdə təhsilə maraq yüksək idi. Bu da bizə, müasir tarixçilikdə zənn edildiyinin əksinə, orta əsr insanlarının təhsil və elmdən uzaq, savadsız kütlələr olmadığını deməyə əsas verir.

**Açar sözlər:**
tədris, dərs, məktəb, mədrəsə, talib, talibə, təlim, müəllim, kitab, vəqf, kitabxana.

**DOI:**
**Məqaləyə istinad:** Əkbər N. Nəcəf. Orta əsrlər Azərbaycanında təhsil anlayışı, strukturu, metodologiyası və tədris vasitələri (X-XVI əsrlər). *«Azərbaycan məktəbi» jurnalı.* № 2, 2018. səh. 107–123

**Məqalə tarixçəsi**
Göndərilib: 16.05.2018; Qəbul edilib: 13.07.2018; Nəşr edilib:

# The educational concept, its structure, methodology and teaching tools of medieval Azerbaijan (X-XVI centuries)

**Akbar N. Najaf**

**Author:**
Akbar N. Najaf,
A researcher of general Turkish history of the Middle Ages.
Azerbaijan, Baku.
ekbernecef@gmail.com

**Abstract.** Some issues of the medieval history of Azerbaijan in modern local and foreign historiography were considered in general. These studies mainly cover study areas (madrasah and Sufi associations) and some areas of culture (science, literature and architecture). In our research, we studied issues that have not been covered in our cultural history, including teaching time, levels, educational rules, textbooks, libraries, academic year, scholarships to students and teachers' salaries, orphans and homeless children. Since the rich cultural heritage of the Middle Ages was often studied in the light of political and social events, issues directly related to human life were in the background. However, the material, religious, legal and spiritual culture of the Middle Ages was often at the forefront of political events. The attention of medieval Azerbaijani rulers in many cases to the personality of the scientist and poet indicates the level and importance of the period of instruction. Sources tell of medieval Azerbaijan about the great number of scholars and educators, large and renowned libraries and the education of the people, who teach in many madrasahs, cities of great importance and even foundations of cities. During this period, we have witnessed some areas of science, in particular literature, political science (sofas and palace schools), as well as the widespread popularity of medicine. It is noteworthy that special schools functioned for the training of civil servants and statesmen, even state servicemen during the training period. As a result, interest in education in the Middle Ages was high. This, unlike what we thought in modern history, gives us grounds to say that medieval people are far beyond education and science and are illiterate.

**Keywords:**
teaching, lesson, school, madrasa, student, training, teacher, book, foundation, library.

**DOI:**
**To cite this article:** Akbar N. Najaf. The educational concept, its structure, methodology and teaching tools of medieval Azerbaijan (X-XVI centuries). *Azerbaijan Journal of Educational Studies.* No2, 2018. pp. 107–123

**Article history**
Received: 16.05.2018; Accepted: 13.07.2018; Published:

### Təhsil sahələrinin müxtəlifliyi

Orta əsrlərdə Azərbaycanın təhsil sistemi Şərqi İslam coğrafiyası təhsil sisteminin bir parçası idi. Bu təhsil sistemi, sadəcə, mədrəsələrlə məhdudlaşmırdı. Birincisi, Şərqi İslam coğrafiyasında təhsil geniş bir sistem təşkil edirdi və siyasi-sosial sahənin bütün qollarına sirayət etmişdi. İkincisi, təhsil imkanları və məkanları müxtəlifliyinə görə seçilirdi. Üçüncüsü, təhsilli olmaq cəmiyyətdə xüsusi bir status sayılırdı. Dördüncüsü isə orta əsr dövlətlərinin kadr siyasəti təhsilli insanların idari-inzibati mexanizmada yer almasına söykənirdi.

Tədqiqatçı alim Əli Məzahiri 1951-ci ildə Parisdə fransızca nəşr etdirdiyi «Ortaçağda müslümanların yaşayışları» adlı əsərində X əsrdən etibarən təhsil sahəsində İslam dünyasında bir inqilab olduğunu yazır: «O vaxta qədər orta əsrlərin Orta Şərqində məktəb olaraq, sadəcə, məscidlərdə uşaqlara verilən əqaid (inanc) dərsləri və müsəlman filosoflar, yaxud mötəzilə tərəfindən yaradılmış olan və akademiya sayıla biləcək «Dar əl-Hikmət»lər məlum idi. Bu ikisi arasında ikinci dərəcəli bir təhsil anlayışı mövcud deyildi. Buna görə də X əsrdən əvvəl təşkilatlanmış ümumi bir təhsil anlayışının olmadığını qəbul etməliyik. Xalq əqaidi (inancları), dinin praktik tərəflərini, bəzi yazı və hesab qaydalarını öyrənməklə kifayətlənərkən, sosial təbəqənin zirvəsində yer alan, çoxu mötəzilə anlayışlı ilahiyyatçılar, hökmdarlar və siyasətçilər fəlsəfə və dəqiq elmlər oxuyurdular» [Mazaheri A. 1972, s. 159].

X əsrdə Orta Asiyada Qaraxanlılar (766-1212) və Misirdə Fatimilərdən (909-1171) başlayıb, Qacarların son dövrünə qədər təsirini qoruyan mədərəsə təhsili yeganə təhsil sistemi deyildi. Aparılan araşdırmalar orta əsrlərdə Azərbaycan da daxil olmaqla İslam ölkələrində başlıca təhsil mərkəzlərinin aşağıdakı kimi olduğunu qeyd edirlər:

- məktəblər və küttablar;
- suffə;
- məscidlər;
- camilər;
- saraylar və divan məktəbləri;
- kitabxanalar və kitab dükanları;
- üləma evləri;
- ədəbi məkanlar;
- badiyə (çöl);
- hərəm məktəbləri (saray qadınları üçün);
- mədrəsələr;
- ribatlar və dərgahlar.

Adları qeyd olunanlar arasında əsas təhsil müəssisələri kimi mədrəsələr, saraylar, məscid-camilər ilk sırada gəlirdi [Çelebi A. 2013, s. 23 və d.]. Bu təhsil ocaqlarının hamısı xalq arasında ümumilikdə *məktəb* adlanırdı. Dinin mərkəzində *kitab* olması səbəbindən, məktəb anlayışı kitaba əsaslanan bir oxuma və öyrənmə sistemi idi. Lakin zamanla məktəb insanlara verilən ilk təhsil sistemini əhatə etməyə başladı. George Makdisinin də qeyd etdiyi kimi, «məktəb və ya küttab, sadəcə, ilk dərəcə təhsil verən məkanı» ifadə etməyə başladı [Makdisi G. 2007, s. 58].

O dövrün təhsil anlayışları arasında «badiyə»nin adı xüsusilə zikr edilməlidir. *Badiyə* ərəbcə «çöl» mənasına gəlir. Bir dili bütün incəlikləri və mükəmməlliyi ilə öyrənmək üçün təhsilli insanlar çöldə yaşayan qəbilələr arasında yaşayırdılar. Bu təhsilə badiyə adı verilirdi. Məsələn, X əsrin məşhur şairi Seyyiduk Bəsrədəki təhsilini və ədəbi araşdırmalarını tamamladıqdan sonra klassik ərəbcə təhsilini artırmaq məqsədilə badiyəyə getmiş və fasiləsiz on il bədəvi qəbilələr arasında qalmışdır. Onun müasiri olan Tənubi, Seyyidukun çalışmalarından bəhs edərkən «Vasıtın ən məşhur şairi, bir lüğət müəllifi və dilçi alim» olaraq söz edir [Çelebi A. 2013, s. 23 və d.]. Bu da badiyə təhsilinin bir növ praktika və ali dərəcəni artırmaq olduğunu deməyə imkan verir. Eyni anlayış türklər arasında da mövcud idi. Mahmud Kaşqari 1072-1074-cü illərdə yazdığı «Divani Lüğəti-t-Türk»də yer alan kəlmələrin çoxunu köçəri həyat sürən türk tayfalarının dilindən toplamışdı.

### Təhsil müddəti və səviyyəsi

Məktəblərin təhsil anlayışı, zənn edildiyi kimi, şagirdlərə ibtidai təhsil verməklə məhdudlaşmırdı. Məktəb və ya küttab təhsili alan şəxs əsər yazacaq dərəcədə savada yiyələnirdi. Məsələn, *Zahiriyyə* məzhəbinin banisi olan Davud ibn Əli əz-Zahirinin oğlu Məhəmməd küttab təhsili alsa da, «Kitab üz-zəhra» adlı məşhur əsərini ərsəyə gətirmişdi.[1] O, bu əsəri yazdığı vaxt 15 yaşında idi. Yenə XI əsrdə Vasıt şəhərindən olan bir şairin məktəb təhsilini bitirdikdən sonra dövlət idarəsində katibliyə başladığı qeyd edilir. Rum mənşəli olan və «Kitab əl-buldan» adlı ensiklopedik bir əsər ərsəyə gətirən Yaqut əl-Həməvi kölə həyatı yaşadığı halda, tacir olan sahibindən oxumağı və yazmağı öyrənmiş və onun tərəfindən məktəbə göndərilmişdir. Yaqut əvvəlcə sahibi üçün, onun vəfatından sonra isə özü həm tacir, həm də sahaf (kitab satıcısı) olaraq fəaliyyət göstərmişdir. O aldığı ibtidai təhsillə içində Azərbaycan haqqında da mühüm məlumatların yer aldığı çoxcildli və qiymətli bir əsəri bizə miras qoymuşdur [Brockelmann Carl.1942, s. 249-250]. Bu nümunələrdə məqsəd, məktəb və küttablarda verilən təhsilin yüksək səviyyəsini vurğulamaqdır.

Məktəblər şagirdi, əsasən, *ədəb* elmləri sahəsində *ustad* hesab edilən bir alimin nəzarətində, bir növ, ali təhsilə hazırlayırdı. Bu elm ocaqlarında təhsil 10 ildən az davam etmirdi. Xəlifə Məmun nəslindən olan Əhməd ibn Əli əz-Zəvvalın (1115-1190) on illik təhsildən sonra məktəbdən 14 yaşında ayrıldığını nəzərə alsaq, bir müsəlman üçün ibtidai təhsilin 4-5 yaşından başladığı, bu yaş həddinin 7-8-i keçmədiyi məlum olur [Makdisi, s. 59]. Lakin oxumaq və yazmaq arzusunda olan və bu istəyini uşaq və gənclik yaşlarında həyata keçirmək imkanı əldə etməyənlər də istədikləri yaşda ibtidai təhsil üçün məktəblərə müraciət edə bilərdilər. Belə ki, Yaqut əl-Həməvi böyük yaşlarında məktəbə getmişdi.

Orta əsrlərdə Azərbaycanın da daxil olduğu Şərqi İslam coğrafiyasında təhsilin müddətini və təhsil səviyyəsini tam dəqiqləşdirmək üçün Yaqut əl-Həməvinin Qəznəvi sultanlığının (962-1187) məşhur tarixçisi Beyhakinin avtobioqrafiyasında verdiyi məlumatlara müraciət etmək olar. Həməviyə görə, Əbülfəzl Beyhaki 15 yaşına çatana qədər məktəbdə *nəhv, lüğət* və ədəb-şeir təhsili almış və bu dərsləri 11 kitabdan keçmişdir. Həmin əsərlər arasında fiqh (hüquq-şəriət), canlılar (təbiət), səmavi cisimlər (astronomiya) və ərzi varlıqlar haqqında məlumat verən ərəbcə-farsca lüğət də yer alırdı [Makdisi G., s. 59]. Bu son məlumat məktəbdə şagirdlərə elmlərin təməl terminologiyasının öyrədildiyini deməyə əsas verir.

Məktəbi tamamlayanlar əlavə 10-11 illik ali təhsilə davam edə bilərdi. Ali təhsil, əsasən, hüquq *(fiqh),* tibb *(təbabət)* kimi yüksək peşəkarlıq tələb olunan sahələrdə çalışmaq üçün vacib idi. XII əsrdə yaşamış Orta Asiya tarixçisi, mühəddis, ilahiyyatçı və filoloqu Əbu Səad Əbdülkərim ibn Məhəmməd əs-Səmani ət-Təmimi əl-Mərvəzi (1113-1167) içində yüzdən çox Azərbaycan alimi haqqında da məlumatın yer aldığı «Kitab əl-ənsab» (Nisbələr kitabı) adlı əsərində İslam dünyasında təhsilin mükəmməlliyi haqqında qiymətli məlumatlar verir. Onun əsərində adını zikr etdiyi Urmiyə, Xoy, Ərdəbil, Maku, Naxçıvan, Şamaxı, Gəncə, Beyləqan və s. şəhərlərdən çıxmış yüzlərlə alimin 10 il məktəb və 10-11 illik mədrəsə təhsili aldıqdan sonra Misir Qahirəsindən Orta Asiyanın Şaşına qədər geniş coğrafiyada katiblik, təbiblik, qazılıq və müdərrislik (mədrəsə müəllimliyi) etdikləri xəbər verilir [N.Əliyeva.2010, s. 91-133].

Təhsilin səviyyəsinə və dərəcəsinə görə Azərbaycan məktəbləri və mədrəsələrinin, vəqfiyyə və saraylarının digər böyük İslam şəhərlərindəkindən heç də geri qalmadığını XI əsrdə Azərbaycanda olmuş görkəmli ərəb alimi İbn Makulanın (1030-1082) Gəncə məscidi, mədrəsəsi və kitabxanası haqqında

[1] «Kitab əz-zəhra», yəni «Çiçək kitabı» bir növ şeir antologiyasıdır. Məhəmməd ibn Davud həmin kitaba seçdiyi şeirləri nəsr şəklində toplamışdır.

verdiyi məlumatlardan anlayırıq. O, əsərində 55 nəfər azərbaycanlı alimin adını qeyd edərək onların yetişdiyi elmi mühitin təhsil imkanlarına da işıq tutur [Əliyeva N. 2014, s. 20]. Azərbaycan şəhərlərində yüksək təhsil verən ocaqların hələ VII-VIII əsrlərdə formalaşdığını təbrizli alim Vəliyuddin Əbu Abdullah Məhəmməd ibn Abdullah əl-Əmri ət-Təbrizinin Azərbaycan mütəfəkkirlərini də əhatə edən VIII əsr alimlərinin qısa həyat hekayəsini əks etdirən *«əl-İkməl fi əsmə ər-ricəl»* əsərindən anlayırıq.[2] Digər tərəfdən, «Kitab əl-Müştərək» adlı əsərdə ümumilikdə Azərbaycanın 21 məntəqəsi haqqında məlumat verilib, həmin yerlərdəki təhsil məkanlarına da toxunulmuşdur [Əliyeva N. s. 62].

Artıq XI əsrdən etibarən Səlcuqlar, sonra isə Atabəylər dövründə Azərbaycanda bütün Şərqi İslam coğrafiyasında tanınan məktəblər, mədrəsələr, saray məktəbləri mövcud idi. Tədqiqatçı Nərgiz Əliyeva bir əsərində həmin dövrdəki Azərbaycanın ali məktəblərinin siyahısını tərtib etməyə çalışıb. Həmin əsərdə Gəncə, Şamaxı, Beyləqan, Marağa (Atabəylər, Qazı, Əhmədağa), Zəncan, Naxçıvan, Mərənd və Xoy mədrəsələrinin adları çəkilir [Əliyeva N. 2015, s. 67-74, 78, 84, 85, 86].

Cəlayirlər, Qaraqoyunlular, Ağqoyunlular və Səfəvilər dövründə Azərbaycanda çox sayda mədrəsələr fəaliyyət göstərirdi. Tacəddin şah Əlişah mədrəsəsi, Rəşidəddinin oğlu Qiyasəddin Məhəmmədin Qiyasiyyə mədrəsəsi, Əmir Şeyx Həsən Cəlayiri mədrəsəsi, Şeyx Üveys mədrəsəsi, Sultan Əhməd Cəlayiri mədrəsəsi, Sahənşahın arvadı Xədicə Bəyimin tikdirdiyi Müzəffəriyyə və Bəyim mədrəsələri bunlara nümunədir. Bu mədrəsələrin hər biri elmin müxtəlif sahəsində mütəxəssislər yetişdirirdilər. Məsələn, Şamaxının Məlhəm kəndində açılan və uzun illər fəaliyyət göstərən «Mədrəseyi-tibb» həm yüksək səviyyəli tibbi təhsil mərkəzi, həm də xəstəxana idi. Bu mərkəz görkəmli şair Xaqaninin əmisi Qafiyəddin Ömər ibn Osman tərəfindən açılmışdır. Məşhur həkim və filosof olan Qafiyəddinin Şamaxı mədərəsəsi ilə olan əlaqələrini nəzərə alsaq, həmin dövrdə mədərəsələr arasında tələbə mübadiləsinin olduğunu düşünmək olar. [Əliyeva N. 2015, s. 86].

Tədqiqatlardan belə məlum olur ki, oxumaq arzusunda olanlara verilən ilkin təhsil müddəti maksimum 10-11 il idi. Ancaq məktəbə başlayan bütün şagirdlərin bu təhsil müddətini tamamladıqları iddia edilə bilməz. Böyük əksəriyyətin, Əli Məzaherinin qeyd etdiyi kimi, təməl əqaid elmlərini əldə edərək məktəbləri tərk etdiyinə inanmaq lazımdır. Məktəb və küttabları tamamladıqdan sonra başlayan ali təhsil isə minimum 10-11 illik olub, bu müddətdən sonra icazət (diplom) alanlar xəstəxanalarda, mədrəsələrdə, hüquq sistemində işlə təmin olunurdular. Bu bizə bir mütəxəssisin təhsil həyatının, orta hesabla, 20 ildən az olmadığını deməyə əsas verir. Belə məlum olur ki, 4-5 yaşından məktəb həyatına başlayan bir uşaq, 25 yaşında ali təhsil ocaqlarının birindən məzun olmaq şansına sahib idi. Ancaq təhsilini bu müddətlə məhdudlaşdırmayıb, davam etdirənlər də vardı. Məsələn, Beyhaki təhsil həyatını 37 yaşında tamamlamışdı. Bu onun, təqribən, 30 ildən çox təhsil aldığını deməyə əsas verir [Makdisi G., s. 60].

Ali təhsilin müddətləri arasında fərq məktəblərin dərəcə və əhəmiyyətinə görə də yaranırdı. Məsələn, *divan məktəbləri,* bir növ, siyasi idarəetmə profilli universitetlərin missiyasını icra edirdi. Bu məktəblərdə dövlət işlərində katiblikdən vəzirliyə qədər xidmət edən şəxslər təhsil alırdılar. Sultanlar *qulam* olaraq işə götürdükləri hərbi, siyasi və təhlükəsizlik xidmətlərindəki məmurlarını da həmin məktəblərdə yetişdirirdilər. Qul kimi alınıb dövlət məmuru dərəcəsinə qədər yüksəldilən həmin qulamların 30 yaşından tez rəsmi vəzifə tutmadıqlarını Nizamülmülk «Siyasətnamə» əsərində qeyd edir [Nizamülmülk, Siyasətnamə, 1999, s. 74; Əkbər N. 2017, s. 160]. Bu məktəblərdə *riyazi elmlərə*

[2] Bu əsər «Muşkətul-məsahib» adlı əsərlə birlikdə 1898-1899-cu ildə Peterburqda rus dilində nəşr olunub.

böyük üstünlük verildiyi də qeyd edilir. X əsrdə yaşamış Əbu Cəfər ibn Şirzad 20 yaşına çatdığı halda divan məktəblərində təhsilinə davam etdiyini xəbər verir. Hətta Şirzad özündən böyük qardaşının da eyni məktəbdə oxuduğunu yazır [Makdisi G., s. 76].

Saray və ya divan məktəbində təhsil almaq dövlət sistemində çalışmaq və yüksəlmək üçün əsas vasitə idi. Məsələn, Fatimilər dövrünə aid bir məlumatda həmin vəziyyət belə izah edilir: «O zamanlar hər divan məmurunun ədəb sahəsində bir az dərs almış oğlunu katiblik sənətini öyrənməsi üçün divana gətirməsi adətə çevrilmidşi. Tələbə burada təhsil alır, ədəb elmlərinə maraq göstərib, öyrənirdi». Bu məlumatın Əyyubilər dövlətinin vəziri olmuş Qazi Fazil əl-Beysani tərəfindən qeyd edilməsi olduqca mühümdür. Çünki Beysani özü həmin təhsil sistemində yetişərək əvvəlcə Fatimilər dövlətində yüksək rütbəli dövlət məmuru, sonra isə Əyyubilər dövründə baş vəzir olmuşdur [İbn Xəllikan, 1948-1949, s. 219]. Belə ki, Beysaninin özünü də divan məktəbinə Fatimilər dövründə divan rəisi olan İbn əl-Xəllal imtahanla qəbul etmişdi [İbn Xəllikan, 1948-1949, s. 220]. İbn Xəlliqanın verdiyi məlumatlardan aydın olur ki, məmur övladları olmasına baxmayaraq, divan məktəbinə qəbulda şagirdlərə güzəşt edilmirdi. Belə qəbul imtahanları xeyli çətin və ciddi elmi mühakimələr aparılaraq keçirilirdi. Beysaninin özü həmin qəbul imtahanında «Hamasə»də yer alan iki hadisəni təhlil etdiyini, verilən nəzm parçalarını nəsr halına gətirdiyini, hətta lazım gələrsə, əvvəldən axıra bütün kitabın bu şəkildə təhil edilməli olduğunu qeyd edir [İbn Xəllikan, 1948-1949, s. 220]. Yeri gəlmişkən, onu da qeyd edək ki, Beysaninin atası Fələstin qazısı olub, dövlət sistemində məmurlardan da yüksək mövqeyə sahib idi [İbn Xəllikan, 1948-1949, s. 224].

Bu qeyd etdiklərimiz orta əsrlərdə təhsil sisteminin əsas iki dərəcəli olduğunu deməyə əsas verir:

• Birinci dərəcə — *təlim* adlandırılan təməl təhsil, bir növ, günümüzdəki orta və ali məktəb təhsili idi. Buradan məzun olanlar məmur, aşağı səviyyədə katib, müxtəlif dini vəzifələrə sahib olduqları kimi, elmin müxtəlif sahələrində də fəaliyyət göstərə bilərdilər.

• İkinci dərəcə isə *suhbə* adlandırılırdı, hazırkı dövrün magistratura və doktorantura təhslinə bərabər hesab olunan təhsil idi. İxtisaslı kadr hesab olunan suhbə təhsilli məzunlar vəzirlikdən qazılığa, divan rəisliyindən müdərrisliyə, hakimlikdən fəqihliyə, kitabxanaçılıqdan elçiliyə qədər bütün rəsmi (saray) və qeyri-rəsmi (vəqflərdə) üst səviyyəli vəzifələrdə çalışa bilərdilər.

### Dərs ilinin açılışı

Məktəb və mədrəsələrdə tədris ilinin açılışı XI əsrdə təkmilləşdirilmişdir. Açılışlar, əsasən, təntənəli şəkillərdə gerçəkləşdirilirdi. Buna səbəb hakim dairələrin belə açılışları özləri üçün hörmət əlaməti saymaları idi. Açılış dərsləri sadəcə müdərrislər üçün deyil, həmin bölgənin qazıları, qadıl-qudatları (baş qazı, qazılar qazısı), elm mənsubları və alimləri üçün də əhəmiyyət kəsb edirdi. Açılış dərsində ilk dəfə müdərrisliyə başlayan müəllimlər böyük kütlənin hüzurunda kürsüyə çıxır və ilk dərsini verirdi. Demək olar ki, şəhərin bütün təbəqəsindən insanlar onun dərsinə qulaq asıb qiymət verirdilər [Makdisi G., s.235].

Məktəb və ya mədrəsəyə təyin olunan alim açılış dərsində müxtəlif mövzulara  və ya bir mövzu içərsində bir neçə məsələyə toxuna bilərdi. Buna görə də müəllimin istədiyi mövzunu seçib, həmin mövzuda mühazirə oxumağa ixtiyarı var idi. Təhsil ilinin açılışı təntənəli mərasim halında qeyd edildiyindən mədrəsə, məscid və camilərin həyətində müxtəlif növ şirniyyatlar bişirilir və bunlar şəhərin bütün təhsil məkanlarına və xeyriyyə ocaqlarına paylanırdı. Açılış dərsində iştirak edənlərin sayı, eyni zamanda, o müdərrisə verilən ümumxalq qiymətinin ölçüsü sayılırdı. Əgər iştirak edənlər çoxdursa, bu həmin alimin elmi savadına və böyüklüyünüə dəlalət edirdi. Açılışa gələnlərin azlığı müdərrisin alimliyinə xalqın etinasız yanaşdığını ifadə edirdi. Əgər açılışda kifayət qədər adam yoxdursa, bu,

müdərrisin müəllimlik fəaliyyətinin sona çatdığını xəbər verirdi. Onun ya yerini dəyişdirir, ya müdərrislikdən uzaqlaşdırır, ya da öz üzərində işləməsi üçün əlavə vaxt və imkan tanınırdı [Makdisi G., s. 238].

Açılış dərsləri müəllimlərin öz bacarıqlarını, təhsil səviyyələrini, suallara necə yanaşdıqlarını və elmi məsələləri necə təhlil etdiklərini nümayiş etdirirdi. Burada əsas məsələ alimin öz fikrini ifadə etmək bacarığının olub-olmadığını, hər hansı bir məsələyə yeni yanaşma gətirib-gətirmədiyini xalqın hüzurunda aşkarlamaq idi. Təhsil sisteminin başlıca xüsusiyyətlərindən biri, bəlkə də ən mühümü «kitaba əsaslanan fikirlərə tənqidi yanaşma» metodu idi [Makdisi G., s. 247]. Müəllim və ya alim oxuduqlarını təkrar etməməli və onların təbliğatçısına çevrilməməli idi. Bir növ, alimin elminin xalq tərəfindən təsdiqləndiyi bir sistemdə insanlar öz uşaqlarını həmin müəllimə etibar etmələrinin imtahanını keçirirdilər. Nəzərə alsaq ki, açılış dərslərində mədrəsələrin olduğu bölgə və şəhərlərin bütün elm adamları, fəqihləri, dövlət məmurları, katibləri, hökumət üzvləri iştirak edirdi, o zaman müdərrislər üçün bu imtahanların elə də rahat keçmədiyi ortaya çıxır. Bəzi müdərrislərin açılış dərslərinə rəğbət o dərəcədə böyük olurdu ki, hətta ətraf ölkələrdən və şəhərlərdən alimlər və müdərrislər də bu məclislərdə iştirak edirdilər. İnsanların kütləvi şəkildə təhsil mərkəzlərində toplanması üçün ən uyğun zaman isə Həcc mərasimlərinin başladığı zamanlar idi. Bu da bizə, tədris ilinin açılış tarixinin Həcc mərasimlərinin başladığı aylarda olduğunu deməyə əsas verir [Keleş M., 2016, 4 (8), s. 158-159].

Bəzi idarəçilər müdərrislikdə şöhrət sahibi olan alimləri öz mədrəsələrinə dəvət edirdilər. Həmin alimin bu təklifi qəbul edib, o mədrəsəyə gəlməsi, o şəhərin etibar qazanmasına yol açırdı. Məsələn, Anadolu Səlcuqlu dövlətinin vəziri Pərvanə 1273-cü ildə Kayseridə tikdirdiyi mədrəsəyə Elxanlı dövrünün böyük alimlərindən olan Qütbəddin Şirazini dəvət etmişdi. Vəzir Pərvanə bu alimin elmi istedadına və əxlaqi böyüklüyünə Sədrəddin Konəvinin «Cami əl-üsul» dərslərində şahid olmuşdu [Kaymaz N., Pervae M., 1970, s. 185].

Bu, mədrəsələr, şəhərlər, hətta idarəçilər arasında rəqabətə səbəb olurdu. Belə ki, alimlikdə ad çıxarmış bir müdərrisin hansısa şəhərə gəlib oradakı mədrəsədə müəllimlik fəaliyyətinə başlaması o bölgə və şəhərdə güclü sosial, mədəni, insani təsir yaradırdı. Bir alimin yer dəyişdirməsi onunla birlikdə ciddi bir elmi gücün yerini dəyişdirməsi mənasına gəlirdi. Bir anda adi bir şəhər elm mərkəzinə çevrilə bilərdi. Bu öz növbəsində həmin şəhərin ticari imkanlarına təsir edir, dini ziyarətlər sırasında böyük karvanların öz istiqamətini o şəhərdən salmasına yol açırdı.

Açılış mərasimlərinin bu qədər təntənəli keçirilməsindəki məqsədlərdən biri də müdərrislə birlikdə həmin şəhərin və idarəçilərin öz təbliğatını aparmaq fürsəti əldə etmələri idi. Buna görə də bir çox idarəçilər tanınmış alimlərin öz mədrəsələrini dəyişdirməsini istəmir və lazım gəlsə, onun üçün əlavə maddi-mənəvi imkanlar yaradırdılar.

Orta əsrlərin müəllifləri, xüsusilə də avtobioqrafiya yazan elm adamları ölkələr arasındakı səyahətlərini şöhrətini eşitdikləri alimlərin dərslərinə və bu dərslərdəki məharətlərinə şahid olmaq üçün planlayırdılar. Əgər İbn Məqkulə, Səmani, Yaqut əl-Həməvi alimlərin həyat hekayəsini yazmaq və hazırlamaq üçün Azərbaycana gəlmişsə, bunda onların dərslərində iştirak etdikləri mühəddislərin rolu böyükdür. Artıq XI əsrdə Gəncəni ziyarət edən alimlərin sayında artım dövrün mənbələrində də əks olunmağa başlayır. N.Əliyeva yazır ki, «ərəbdilli müəlliflərdən bəziləri şəhərə səfər edərək onun məscidi, kitabxanası, tədris müəssisələri, burada təşkil olunan hədis məclisləri, yerli alimlərlə görüş və müzakirə apardıqları məclislər və s. haqqında bilgi vermişlər» [Əliyeva N., s. 31]. Oxşar mənzərəyə Təbriz, Şamaxı, Ərdəbil və digər şəhərlərdə də rast gəlmək mümkündür.

## Müəllimlər və tələbələr

Orta əsr təhsil sistemində müəllimlər və tələbələr arasında dərəcələndirmə onların aid olduqları mədərəsə, məktəb və küttablara görə fərqlənirdi. Müəllimlər arasındakı dərəcələndirmə bu şəkildə idi:

- Muid[3] ;
- Müfid[4] ;
- Müdərris və ya dərsiam[5].

Şagirdlər və ya tələbələr arasında dərəcələndirmə isə belə aparılırdı:

- Tələbə-i ülum (suxtə, softa)[6] ;
- Danişmənd[7];
- Müləzim[8].

Bu sıralama xaricində müəllimlər və tələbələrin öz titulları var idi. Məsələn, müəllimlər arasında *molla, əllamə, qare, mühəddis* və *fəqih* kimi titullar əsas qəbul edilirdi. Mədrəsə kadrlarının çoxalması və mədrəsə təhsil sisteminin təkmilləşdirilməsi ilə müdərrislər arasındakı dərəcələndirmə də dəyişmişdir. Buna görə hər mədrəsədə *ulə̲* (ilk), *s̲aniyə* (ikinci) və *səlisə* (üçüncü) olmaqla üç müdərris vəzifələndirilmişdir.

Yuxarıda da qeyd etdiyimiz kimi, tələbəlik dövrü 14-15 yaşdan başlayırdı. Bu yaşa qədər uşqalar şagird sayılır və məktəb təhsili alırdılar. 14-15 yaşından mədrəsə təhsilinə başlayan tələbə 20-21 yaşlarında mübahisə etmək, bir mövzunu sərbəst işləmək, tələbələr arasında çalışmalar aparmaq səviyyəsində elmi bacarığa sahib olurdu [Anameriç H., Rukancı F., 2008, s. 40].

## Təhsil metodologiyası

Mədrəsələrdəki təhsil *deduktiv* adlandırılan metoda əsaslanırdı. Bu metodun əsasını müəyyən mövzularda əsər yazmış və bir neçə məsələdə fikir bəyan etmiş alimlərə bağlılıq və onları dinləmək təşkil edirdi. Bu təhsil metodu əzbər *(hifz)*, təkrar, qavrama, müzakirə və qeydlər aparmaq *(dəftər)* şəklində gerçəkləşirdi.

Hifz, yəni əzbər, təhsil metodologiyasının əsasını təşkil edirdi. Hifz etmək, G.Makdisinin açıqlamasına görə, «bol miqdarda materialların əzbərlənməsinə, mənalandırılmasına və müəyyən məsafələr buraxmaq şərti ilə təkrarlanmasına söykənirdi». Xüsusilə də Quran, lüğət, rəvayət, fiqh və şeir dərsləri sözün həqiqi mənasında tələbənin hafizə gücünə bağlı dərslər idi [Makdisi G., s. 241]. Lakin belə hafizə gücünə sahib tələbələr nadir hallarda ortaya çıxırdı. Məhz bu səbəbdən Şabi kimi bir alim «əgər biri, sadəcə, mənim unutduqlarımı əzbərləmiş olsaydı alim olardı» deməklə hifzin hər zaman mümkün olmadığını dilə gətirmişdi. Amma Şabidən fərqli olaraq güclü hafizəyə sahib tələbələr və alimlər də

---

[3] Mədrəsələrdə müzakirələr aparanlar, müdərrislərin köməkçiləri səviyyəsində olanlara verilən ad. Bəzi mədrəsələrdə xüsusi bir sinfə nəzarət edənlərə, tam olaraq dərs demək vəzifəsi olmayanlara bu ad verilirdi. Muid, bir növ müdərris ilə tələbə arasında vasitəçi rolunu oynayırdı. Bu vəzifə günümüzdə «assistent» dərəcəsinə uyğun gəlir.

[4] Əsasən, XV-XVI əsrlərdə işlədilməyə başlanılan bu termin muiddən bir dərəcə yüksək, müdərrisdən bir dərəcə aşağıda yer alan, günümüzdə «dosent» dərəcəsində olan müəllimləri ifadə edirdi. Müfidlər mədrəsələrdə oxudulan dərslərdə müdərrisin ərz etdiyi, ancaq tələbənin tam vaqif olmadığı məsələləri təhlil edib açıqlayırdılar.

[5] Müdərris və ya dərsiam mədrəsələrdə dərs demək hüququ olan müəllimi ifadə edirdi. Müdərrislər tam elm sahibi olub, təhsil sistemində ən üst səviyyədə yer alan alimlik dərəcəsinə sahib şəxslər idi.

[6] Softa – mədrəsə tələbəsi mənasında olub, xalq arasında istifadə edilən bir termin idi. Mədrəsə müəllimlərinin sözlərinə görə, elm eşqi ilə alışıb-yanan uşaqları xalq bir az da kinayə ilə «suxtə» adlandırırdı. Həmin ad daha sonra dəyişərək *softa* şəklini alıb.

[7] Mədrəsə təhsili almış insanlar üçün istifadə edilən bir sifətdir. Farsca bir termin olan danişmənd Elxanilərdən sonrakı dövrlərdə sürətlə yayılmağa başladı. Danişmənd adını alan tələbə «elm sahibi» hesab olunurdu.

[8] Mədrəsə təhsilini tamamlayıb icazət (diplom) alan tələbəyə verilən ad.

vardı. Məsələn, Makdisi, Xələf əl-Əhmərin 40 min beyt əzbərlədiyini qeyd edir [Makdisi G., s. 241].

Hifz etmək təhsildə çox mühim idi. Qəzali bir səyahət sırasında kitablarının quldurlar tərəfindən talan edilməsindən sonra artıq oxuduğu bütün kitabları əzbərlədiyini qeyd edir. XII-XIII əsrlərdə yaşamış Ziyaəddin İbn əl-Əsir hafizənin əhəmiyyətini vurğulayaraq əzbərləmənin müəyyən zaman və ya ehtiyac halında lüzumundan bəhs edir [Makdisi G., s.243].

Hafizə orta əsrlər təhsil sistemində olduqca mühüm idi. Fiqhi hökmlərin verilməsində, hədislərin nəqlində, yazılı münasibətlərin az olduğu dövrdə məlumatların ötürülməsində əzbərin əhəmiyyəti ortaya çıxır. Dilçi və tarixçi Qazı Vaki (918-ci ildə vəfat edib) təhsildə hafizə və əzbərin əhəmiyyətinə diqqət çəkərək yazır:

*Tələbələr elm tələbi ilə erkəndən qalxar,*
*Bu bir gün kitablarda əbədiləşir,*
*Mən də irəliləyirəm şövq və ciddiyətlə*
*Dəftərdir qəlb, hoqqadır qulaqlar.*
[Makdisi G., s. 244].

Təhsildə qavrama və müzakirə də hafizə qədər əhəmiyyətli idi. Əslində, həm qavrama, həm də müzakirə əzbər təhsil anlayışına dəstək mənasına gəlirdi. Terminlərin, kəlmələrin, mənaların qavranılması onların yaddaşda tutulmasını asanlaşdırırdı. Müzakirə üsulu tələbənin aldığı, müdərrisin isə verdiyi dərsin öyrənilməsində istifadə edilən əsas metod hesab olunurdu. Müdərris tələbələri sorğu-suala çəkdiyi kimi, əksi də olurdu. Həftənin bəzi günlərində müdərrislər xalqa açıq dərslər təşkil edirdilər. Müəllim bir məsələdə özünün gəldiyi qənaətləri açıqlarkən, tələbə müzakirə sırasında, əsasən, əzbərlədiyi alimlərdən istinadlar gətirərək fikrini ifadə edirdi [Anameriç H., Rukancı F., s. 41].

Təhsil metodologiyasında müraciət edilən bir digər vasitə qeydlər aparmaqdır. *Dəftər* adı verilən bu vasitə biliklə dolan və bir növ «bilik anbarı halına gələn yaddaşın» bərpasında köməkçi rolunu icra edirdi [Makdisi G., s. 255 və d.]. Elmdə qeydlər aparmaq elmin açarı sayılırdı. Lakin bəzi elmi dairələrdə kağıza yazılan biliyə münasibət mənfi olmuşdur. Bunu İbn əl-Əllaf (IX-X əsrlər) yazdığı bir mərsiyyədə belə dilə gətirir:

*Biliyi kağıza əmanət etdi və onu da itirdi,*
*Kağız onu mühafizə etmək üçün çox pis yerdir.*
[Makdisi G., s. 256].

Kağıza qarşı bu iddialara etibar etmək hər zaman mümkün deyildir. Əks halda orta əsrlərdə sayları milyonları aşan ədəbiyyatın ortaya çıxması qeyri-mümkün olardı.

Orta əsrlərdə qeydaparmanın xüsusi bir metodu da formalaşmışdı. *Fihrist* adlanan bu metod, bir növ, mənbə və ədəbiyyatın, orada yer alan məlumatların qısa xülasəsini əks edirdi. Ən-Nədimin məşhur «Fihrist» əsəri belə sistemə ən yaxşı nümunədir [Ən-Nədim, 2017, s. 67 və d.].

### Dərslər və dərsliklər

1067-ci ildə Böyük Səlcuqlar dövlətinin (1038-1157) rəsmi «universiteti» kimi fəaliyyətə başlayan Nizamiyyə mədrəsəsinin açılması ilə təhsildə əsas dərs olaraq nəqli (şifahi) elmlər oxudulmağa və öyrədilməyə başlandı. Nəqli elmlərə xüsusi diqqət yetirilməsinin başlıca səbəbi Böyük Səlcuqlar dövlətinin Şərqi İslam coğrafiyasında məzhəb fərqlilikləri və dini ixtilafları ortadan qaldırıb, məzhəbi və dini müzakirələri təhsil ocaqlarına daşıyaraq, elmi ixtilafları alimlərin rəyinə və görüşünə həvalə etməklə, geniş sosial kütlələri dini münaqişələrin mərkəzinə çəkməyə cəhd edən qrupların təsirini azaltmaq idi. Lakin qısa müddətdən sonra nəqli elmlərlə birlikdə əqli elmlər də mədrəsə proqramlarına daxil edildi. Belə olan halda mədrəsələrin təhsil bazası riyaziyyat, tibb, heyət (astronomiya), fəlsəfə, bəlağət (ritorika), hesab, həndəsə (geometriya), lüğət, tarix *(əxbar),* coğrafiya, nəhv (ədəbiyyat), sərf (qrammatika) hesabına

genişləndi. Əqli elmlər təbiət elimləri də adlandırılırdı ki, bunlar müşahidə və məntiq olaraq təsnif edilərək, bəzən ümumi halda *fəlsəfiyyat* adlandırılırdı [Mustafa B., 1984, s. 41-43].

Oğuz türkləri tərəfindən əsası qoyulan Böyük Səlcuqlar dövləti fiqhi əsası olan bütün məzhəblərə özlərinin təhsil sturkturunu yaratmaq imkanı yaradaraq, bu məzhəblərin özlərinin təyin etdiyi dərslərə və dərsliklərə də müdaxilə etmədilər. Üstəlik Səlcuqlar bütün məzhəblərə mənsub olan təhsilli adamlara dövlət sistemində fəaliyyət göstərməyə şərait yaratdılar. Səlcuqların təhsildə «islahat» səviyyəsində apardıqları bu təkilatlanma nəticəsində IX-X əsrlərdə Şərqi İslam coğrafiyasını parçalayan dini-məzhəbi ixtilafların və münaqişələrin kökü kəsildi.

XI-XVI əsrlərdə mədrəsələrdə oxudulan dərslər və istifadə edilən dərsliklər haqqında kifayət qədər məlumat mövcuddur. Bu dövrdə Azərbaycanda şafi, hənəfi, şiə məzhəbinə bağlı insanlar çoxluq təşkil etdiyindən mədrəsələrdəki tədris sistemi də buna uyğun formalaşdırılmışdı.[9]

Mədrəsələrdə tələbələrə keçirilən başlıca dərslər Quran, təfsir, hədis, fiqh, üsuli-fiqh, əqaid, kəlam, bəlağət, sərh-nəhv, astronomiya, həndəsə, hesab (arifmetika), elmi-hikmət (fəlsəfə) olaraq təsnif edilir. Dərsliklər arasında Kəşşaf təfsiri, Qazı Beyzavi təfsiri, sünni məzhəbinin başlıca hədis mənbəyi olan Kütübisittə və şiə hədis kitabları, fiqhdə Əbubəkr Mərginaninin «Bidayə əl-mübtədi» (hüquq), Səfər əl-Hənəfinin «Əqaid ət-Təhavi» (əqaid), Sədrəddin Təftəzaninin «Təlvih» (hüquq metodologiyası), Nəsrəddin Tusinin «Təcrid əl-kəlam» (kəlam), öz dövrünün məşhur bəlağət alimi olan Azərbaycan mütəfəkkiri Ömər əl-Əbhərinin «İsaquci» (ritorika)[10], Məhəmməd Caqmini Xarəzminin «əl-Mülaxxas» (astronomiya), Şəmsəddin Məhəmməd Səmərqəndinin *«Əşkal ət-təsis»* (həndəsə) və Evklidin *«Geometria»*sı, müəllifi naməlum «Risaləyi-bəhaiyyə» (arifmetika) kitabları əsas dərs vəsaitləri idi.[11]

Zamanla dərslərin və dərsliklərin elmi və mövzu baxımından sahəsinin genişləndiyi diqqəti cəlb edir. Məsələn, Səlcuqlar dövründə mədrəsə sisteminə təsəvvüf dərsləri də daxil edilmişdir. Şihabəddin Ömər Sührəverdinin və XVI əsrin böyük sufi alimi Nemətullah Naxçıvaninin təsəvvüf haqqında və Quranın təsəvvüfi təfsirinə dair kitabları da dərsliklər arasında idi.

Bütün mədərəslərdə eyni dərslərin keçirildiyini və eyni dərsliklərin oxudulduğunu düşünməməliyik. Mədrəsələr hazırkı universitetlər kimi müxtəlif fakültə və ixtisaslardan ibarət idi. Nəqli elmlər sahəsində təhsil alanlara təbiət elmləri tədris edilmədiyi kimi, tibb təhsili alanlara da fiqh dərsləri keçmirdilər. Məsələn, tibb mədrəsələrində tələbələrin əsas təhsil müddəti 3 il idi. Bu üç illik müddətdə onlar tibbin, bir növ, nəzəriyyəsini öyrənirdilər. Tələbə həmin dövrdə aşağdakı kitabları oxuyurdu:

*Birinci il*

• Hüneyn ibn İshaqın *«əl-Məsail fit-tibb»* və *«Mədhal fit-tibb»*;

• Hippokratın *«Füsulu-bukrat»* və *«Mə üş-şair»*;

• Nili Nişaburinin tibb risalələri.

Qeyd edilən kitablar, bir növ, tibb elminə başlanğıc xarakterli olub, əsasən, tələbədə bir «sənətkar» kimliyini formalaş-dırırdı.

*İkinci il*

• Razinin *«Kitab ət-tibb əl-Mənsuri»*;

• Kalenosun *«Summeria Alexandrionorum»*u ilə *(Kalinosun 16 məqaləsi) «Təşrih-i bozorg»*;

---

[9] Səlcuqlar dövrü Azərbaycanda yaşayan xalqın dini tərkibi haqqında bəzi məlumatlar üçün bax: Nəcəf Ə., *Aran Atabəyləri,* s. 287-294.

[10] Bu əsər məntiqin bütün sahələrini əhatə edən və mədrəsələrdə oxudulan ilk kitab olması baxımından çox mühümdür. İşlədiyi mövzular və hadisələrə orijinal yanaşmalar baxımından olduqca qiymətli olan bu əsər Avropada da diqqəti çəkmiş və hətta erkən bir dövrdə latın dilinə tərcümə edilmişdir.

[11] Dərslər və dərsliklər haqqında geniş məlumat üçün bax: İzgi Cevat, *Osmanlı Medreselerinde İlim* II, İstanbul: İz Yayınları, 1997.

• Sabit ibn Kürrənin *«Zahirə»*;
• Əbu Bəkir Əsvininin *«Hidayə»*;
• Əhməd Fərəcin *«Kifayə»* və ya *«Əhliyyə»*;
• Seyyid İsmail ibn Həsən əl-Cürcaninin *«Zahirə-i xarimşahi»*;
• Səhli Məsihinin *«Sad Bab»* əsərləri.

*Üçüncü il*
• Razinin *«Kitab əl-xavi»*;
• Əli ibn Abbas əl-Məcusinin *«əl-Kitab əl-mələki»*;
• İbn Sinanın *«əl-Qanun fit-tibb»* əsərləri [Keykavus, Kabusname. 2003, s. 178-179].

Bunlardan savayı həm tələbələrin, həm də həkimlərin daim müraciət etdikləri 16 əsərin adı qeyd edilir:

«*Kitab əl-firaq», «Kitab əs-sina`a», «Kitab ila tusrən fin-nəbz», «Kitab ila ağluqan fit-tə`nni li Şəfa`i-əmraz», «Kitab əl-məqalat əl-xums fit-təşrih», «Kitab əl-astukussat», «Kitab əl-mizac», «Kitab əl-quvata-tabiiyyə», «Kitab əl-iləl vəl-əmraz», «Kitab tuarrifu iləl əl-əza əl-batinə», «Kitab ən-nəbz əl-kəbir», «Kitab əl-humeyyat», «Kitab əyyum əl-bühran», «Kitab əl-bühran», «Kitab hilət əl-bərt», «Kitab tədbir əl-əsihha»* [Kıfti Cəmaləddin Əbil-Həsən Əli ibn əl-Qadi əl-Əşrəf Yusif, 1903, s.129].

Tibb tələbələrinin təhsilinin sonrakı mərhələsi şəfaxanalarda və ya bimaristanlarda (xəstəxanalarda) keçirdi. Burada onlar öyrəndiklərinin praktikasını keçir və təbib adı almaq üçün təcrübə toplayırdılar. Tibb tələbələri praktika həyatlarında xəstə psixologiyası, xəstəxana nizamı, təmizlik qaydaları, ələlxüsus da dərmanların hazırlanması, bitkilərdən və minerallardan necə istifadə edilməsi haqqında zəngin məlumatlar əldə edirdilər. Mükəmməl bir təbibin ortaya çıxması üçün onun 12 qrupda təsnif edilən dərmanlar haqqında, onların hazırlanması və hansı dərdlərə çarə olduğu barədə ətraflı məlumata sahib olması lazım idi. Bu dərmanlar belə təsnif edilirdi: şərbətlər; mürəbbələr; yağ şəklində olan sürtkülər; məlhəmlər; tabletlər; məcunlar; əyaricat; cəvarişat; səfurat; lauqat; tiryək (panzəhər); həblər [Mehmed S. 2014, s. 73-78].

Elxanilər (1258-1359), xüsusilə də Teymurilər (1370-1507) dövründən etibarən mədrəsələrdə astronomiya, tibb və riyaziyyat elmlərinə böyük üstünlük verildiyi nəzərə çarpır [Eshenkulova K. 2001, s. 99-148]. Bunu Elxanilər zamanında Marağada o dövr üçün dünyanın ən böyük rəsədxanasının yaradılması [Köprülü F. 1942, s. 208-227], Qazan xan dövründə (1296-1304) Təbrizdə Şənbi-Qazan və Rəbi-Rəşidiyyənin inşa olunması da təsdiq edir [Özgüdenli O.G. 2003, I, s. 105-126].

### Yetimxanalar və kimsəsiz uşaqların təhsili

Orta əsrlərə xas dağıdıcı istilalar və müharibələr arzu edilməyən insani fəlakətlərə yol açırdı. Bu fəlakətlərdən biri də ailə başçılarını itirmiş uşaqların vəziyyəti idi. Dövlətlər və dövlət başçıları bunu nəzarətdə saxlayır, valideyn himayəsindən məhrum olan uşaqların qayğısı üçün bəzi tədbirlər görürdülər. Bu uşaqlar, əsasən, vəqflərə həvalə edilirdi. Lakin ehtiyac olduqda dövlət yetimxanalar da təsis edirdi. Orta əsr Azərbaycanında dövlət əli ilə təsis edilmiş iki yetimxana haqqında məlumatlar mövcuddur. Bu baxım və təhsil mərkəzləri Elxanlı hökmdarı Qazan xan dövründə (1294-1304) və onun əmri ilə Şənbi-Qazan və Rəbi-Rəşididə təsis edilmişdi. Təbrizdə yerləşən bu yetimxanalardan biri Şənbi-Qazandakı böyük kompleksin içində yerləşirdi. Bu yetimxana başlanğıcda 100 uşağın qalması üçün planlaşdırılmış, daha sonra Təbrizdə küçəyə atılan kimsəsiz uşaqların[12] hesabına genişləndirilmişdir. Yetimxanada uşaqların illik baxım, geyim, qida və təhsil xərcləri Şənbi-Qazan vəqfiyyəsi hesabına qarşılanırdı. Qazan xanın əmri ilə

---

[12] Bu dövrdə Təbrizdə uşaqların küçəyə atıldığını Fəzlullah Rəşidəddinin *«əftl ki, bərah mi-əzdazəd, işan ra bərgirənd»* ifadələri təsdiq edir. Bax: Raşideddin Fəzlullah-i Hemedani, *Tarixi-mübarəki-Qazani (Geschichte Gazan-Hans aus dem Ta`tih-i Mubarek-i Gazani des Resid al-Din Fadlallah b. İmad al-Daula Abu`l-Hair),* transl. and ed. Karl Jahn, London 1940, s. 213.

təsis edilən vəqf uşaqların illik bayramlığını *(eydi)*, tərbiyəçilərin məsrəf və xərclərini də öz üzərinə götürmüşdü. Burada körpəlik yaşını tamamlayan, danışmaq və dinləmək qabiliyyəti qazanmış uşaqlar (ehtimal ki, 4-5 yaşından etibarən) təhsilə cəlb edilirdilər.

Yetimxananın yaxınlığındakı məktəbdə fəaliyyət göstərən beş müəllim uşaqların təhsili ilə məşğul olurdular. Uşaqlara buradan ayrıldıqları zaman özlərini işlə təmin etmələri üçün sənətlər öyrədilirdi. Beləliklə də, onların arasında çoxlu sayda peşəkar sənətkar yetişirdi [Rəşidəddin F., s. 212-213].

Şənbi Qazan yetimxanasının böyük maddi bazasının olduğu qeyd edilir. Belə ki, yetimxananın bütün xərcləri birbaşa Qazan xana aid ərazilərin *(incu)* hesabına ödənilirdi.[13] Hətta bu gəlirlərin vaxtında tənzim və təmin edilməsi üçün xüsusi bir divan yaradılmış və divana nəzarət böyük Elxanlı əmirlərindən Kür Teymur ilə Taramtaza tapşırılmışdı [Özgüdenli O.G., s. 167].

Şənbi-Qazan yetimxanasının Qazandan sonra da fəaliyyətini davam etdirdiyini, hətta Cəlayirlər dövründə mövcud olduğunu Cəlayiri hökmdarı Şeyx Üveysin (1356-1375) şərəfinə *«Qazannamə»* adlı bir əsər qələmə alan Xacə Nurəddin ibn Şəmsəddin Məhəmməd əl-Əjdərinin verdiyi məlumatlardan oxuyuruq.[14]

Digər bir yetimxana Rəbi-Rəşidi kompleksində yerləşirdi. Rəsmi məlumatlarda yetimxananın 10 yetimə qulluq üçün nəzərdə tutulduğu qeyd edilsə də, ümumilikdə, çoxlu sayda yoxsul və kimsəsizlərə xidmət etdiyi məlumdur. Mənbələr Salihiyyə məhəlləsində Rəbi-Rəşidiyyədə çalışan məmurların evlərinin, yoxsul və acizlərə aid binaların (dar əl-məsakin), bir yeməkxananın (mətbəx), ərzaqların saxlandığı anbarların, məscidin (Məscidi-Cami-yi Şəhristan), bazar, zərbxana və bağçanın olduğunu qeyd edirlər. «Eytam» adlanan bu yetimxana 10 yetim və əlavə olaraq kimsəsizlərin sığınacağı idi. Şənbi-Qazanda olduğu kimi, burada da uşaqların baxım, geyim, yemək, təhsil, bayramlıq və başqa xərclərinin hamısı Rəşdiyyə vəqfiyyəsi hesabına ödənilirdi. [Özgüdenli O.G., s. 176].

## Təqaüd sistemi

Məktəb şagirdlərinin aylıq müəyyən bir təqaüd alıb-almadıqları haqqında mənbələrdə tam etibar edəcəyimiz məlumat yoxdur. Lakin eyni fikri tələbələr üçün səsləndirmək doğru deyildir. Çünki mədrəsə təhsil sisteminin bütün xərcləri vəqflər tərəfindən qarşılanırdı.

Məktəblərdə və küttablarda oxuyan şagirdlərin xərclərinin vəqflər tərəfindən ödənildiyi ehtimal olunur. Lakin vəqfiyyələrin təsirinin bütün yaşayış məntəqələrinə yayıldığını düşünmək doğru deyildir. Buna görə bir çox kənd və qəsəbələrdə təhsil xərclərini məscidlərdə toplanan ianələr, bəxşişlər (hədiyyə), xüsusilə də illik toplanan zəkat və xums hesabına tənzimləyirdilər. Orta əsrlərdə (XI-XVI əsrlərdə) böhranlar səbəbindən əgər pulun alıcılıq qabiliyyətində ciddi oynamalar meydana gəlməmişsə, bir uşağın aylıq təhsili üçün 1 dinar kifayət edirdi. Bunu Təbriz yetimxana vəqfiyyə dəftərlərində yer alan məlumatlardan anlayırıq [Vəqfnamə-yi Rəbi-Rəşidi, 1350 hş, s. 139, 163, 214]. Rəşidiyyə vəqfiyyələrində qeyd olunan 1 «Təbriz raic-i dinarı»nın çəkisi 3 misqal (12,96 qram) gümüşə bərabər idi. 1 dinarın alıcılıq gücü 7,5 mənn (6,2 kq) ət, 36 mənn (29,9 kq) təmizlənmiş buğda və 12 mənn (9,9 kq) noxuda bərabərdi. [Vəqfnamə-yi Rəbi-Rəşidi, 1350 hş, s. 141-142, 165, 168, 230].

Yetimxanalarda uşaqlara təqaüd də verilirdi. Bu təqaüd XIII əsrdə bir qoyunun qiymətinin üçdə birinə bərabər idi. 15 aylıq təqaüdlə o dövrdə 1 inək almaq olardı. Bundan əlavə uşaqlara gündəlik 10 mənn (8,3 kq), illik isə

[13] İncu – Elxanilər dövründə hökmdar və hökmdar ailəsinə mənsub olanlara ayrılmış xüsusi əmlak (torpaq, mülk və s.) sahəsi idi. Özgedenli Osman G., *İncu,* DİA (Diyanet İşleri Bakanlığı İslam Ansiklopediyası), c. XXII, s. 281.

[14] Bu əsər haqqında bax: Browne Edward G., *A Descriotive Catalogue of the Oriental Mss. Belonging to the Late E.G.Browne.* ed. Reynold A.Nicholcon, Cambridge 1932, s. 231-236.

2,650 mənn (3041 kq) buğda çörəyinin pulu ayrılırdı [Vəqfnamə-yi Rəbi-Rəşidi, 1350 hş, s. 135, 158]. Böyük ehtimalla, toplanan bu pul yetimxanadan çıxdıqda uşağa verilirdi.[15]

Mədrəsələrdəki təqaüdlər isə bundan on qat çox idi. X əsrdə yaşamış Əbu Cəfər ibn Şirzad böyük qardaşı ilə birlikdə divan məktəbində təhsil aldığını, özünün aylıq 10, qardaşının isə 20 dinar maaşla mükafatlandırıldığını qeyd edir [Makdisi G., s. 76].

Səlcuqlar və Elxanilər dövründə bir tələbənin aylıq xərcləri üçün 10 dinar kifayət edirdi. Bunu həmin dövrlərdə mədrəsədə aşağı səviyyədə bir müəllimin *(molla)* əmək haqqını nəzərə alaraq müəyyən edirik [Nəcəf Əkbər N. 2010, s. 381].

Hələ təqaüdlü təhsil anlayışının olmadığı Səlcuqlardan əvvəlki dövrdə kitab dükanında çalışan bir tələbə İbn Sinanın «Kitab üş-Şəfa» adlı əsərinin üç nüsxəsini əllə köçürmüş və kitabın hər nüsxəsinə 100 dinar pul almışdı. O bu yolla topladığı 300 dinarla təhsilini tamamlamışdı [Zəkəriyyə Qəzvini, 1370, s. 287]. Orta əsr müəlliflərindən və eyni zamanda, müdərrislərindən olan Sübki şahidi olduğu bir hadisəni nəql edir. Belə ki, tələbələrindən biri dərsdən sonra müəllimin yanına gəlmiş və pulunun qalmadığını bildirmişdir. Müəllimi isə onu tanıdığı bir tacirin yanına aparmış və tələbəsinə 50 dinar borc verməsini xahiş etmişdir. Müəllimin sözünü qəbul edən tacir həmin tələbəyə 50 dinar gətirməsi üçün cariyəsini çağırmışdır. Cariyə pulu gətirdikdə tələbə qızın gözəlliyini görüb ona aşiq olmuşdur. Bu vəziyyəti öyrənən müəllimi yenidən tacirin yanına gedərək cariyəsinin tələbəsi ilə evlənməsinə izn verməsini istəmişdi. Bir müddət sonra tələbənin atası ona 600 dinar göndərmiş, o da həmin pulla həm tacirdən aldığı borcu qaytarmış, həm də cariyənin başlıq pulunu və satın haqqını ödəmişdir [Subki, 1323-1324, c. III, s. 163].

Olduqca maraqlı olan bu məlumat Səlcuqlar dövründə bir tələbənin 600 dinarla həm borcunu, həm təhsil, həm də evlilik xərclərini və ehtimal ki, yoldaşı ilə bərabər qalacaqları ev xərclərini də ödədiyini göstərir.

Tələbələrə verilən aylıq təqaüddən başqa, günlük çörək və ət üçün də pul ayrılırdı. Elxanilər və Cəlayirlər dövründə Təbrizdə bir tələbənin aylığı 25-30 dinar arasında dəyişirdi [Özgüdenli O.G. 2006 kitabı içində, s.231].

### Müəllimlərin maaşları

Hələ IX əsrin sonları ilə X əsrin əvvəllərində məşhur tarixçi və fiqh alimi Əbu Cəfər ibn Cərir ət-Təbərinin müəllimlikdən qazandığı aylıq maaşın 10 dinar olduğu qeyd edilir [Fayda Mustafa, 2010, c. 39, s. 315]. Səlcuqlu və Elxanlılar dövründə böyük elmi vəsfi olmayan sıravi müəllimin bu qədər maaş aldığı məlumdur. Sultan Toğrul Bəy dövründə (1038-1063) mədrəsədə müəllimlik edən Əli Tənuhi (1055-ci ildə vəfat edib) aylıq 60 dinar maaş alırdı. Əyyubilər dövründə mədrəsənin baş müəllimləri *(müdərris)* aylıq 30 dinar, digər müəllimlər *(molla)* isə 10 dinar məvacib alırdılar. Elxanilər dövründə Təbriz mədrəsələrində müəllimlərin aylıq maaşı 150-360 dinar arasında dəyişirdi [Vəqifnamə, s. 166]. Hətta 500 dinar maaş alan müdərrislərdən də bəhs edilir.

Rəbi-Rəşididə xidmət edən bəzi müəllim və elm adamlarının maaşları belə idi:

- Əqli elmlər müdərrisi — 500 dinar;
- Təbib — 300 dinar;
- Hədis müdərrisi — 150 dinar;
- Kitabxanaçı — 150 dinar;
- Müəllim — 120 dinar;
- Cərrah — 100 dinar;
- Göz həkimi — 100 dinar;
- Muid (hədis təfsir edən müəllim) — 100 dinar;
- Atabək (yetim uşaqlara müəllimlik edən) — 60 dinar;
- Tibb asistantı — 30 dinar;
- Kitabxana köməkçisi — 30 dinar.

[Özgüdenli O.G., s. 217].

[15] Özgüdenliyə görə, yetimxanadan çıxan uşaq mütləq bir sənət sahibi olmalı idi. Bax: *Tebriz`de İki Yetimhane,* s. 178.

### Mədrəsələrdə və siniflərdə tələbə sayı

Orta hesabla, bir məktəbdə şagird sayı 10-dan az olmurdu. Mədrəsələrdəki tələbə sayı isə mədrəsələrə görə dəyişirdi. Nizamiyyə mədrəsəsinin məzunlarının sayı 6 min idi [Nəcəf Ə., s. 381].

Məşhur alimlərin dərslərinə maraq hər zaman böyük olurdu. Ümumiyyətlə, mədrəsə sistemində bugünkü şəkildə sinif anlayışı yox idi. Müəllimlər dərs otağının mərkəzində otu-rur, tələbələri və dinləyiciləri onun ətrafında dairəvi şəkildə əyləşirdilər. Məşhur alim Cüveyninin dərslərinə hər gün 300 tələbə gəlirdi. Ölümünə yaxın bu rəqəmin 400-ə çıxdığı qeyd edilir. Gələnlərin hamısının tələbə olmadığı, aralarında alimlərin də yer aldığı qeyd edilir [Subki, c. III, s. 252, 255, 259].

Marağa rəsədxanasına Əndəlüsdən də (İspaniya) tələbələrin gəldiyi məlumdur. Bu rəsədxana o dövrdə dünyanın ən böyük elmi mərkəzi hesab olunurdu. Həmin tarixdə Marağada mövcud olan Atabək və Qazı mədrəsələri həm elm adamlarını, həm də tələbələri özünə cəlb edirdi. Onlara Fəzlullah Rəşidəddin tərəfindən tikilmiş başqa bir mədrəsə də əlavə olunmuşdu ki, İslam ölkələrinin müxtəlif yerlərindən təhsil üçün gələnlərlə dolub daşırdı [Kazımi P. 2008, s.13].

### Kitabxanalar

Həm müstəqil, həm də mədrəsə və rəsədxanaların tərkibində kitab sayı onminləri aşan kitabxanalar mövcud idi. Hələ IX əsrdə Həmədanda bir şəxsi kitabxananın yaradıldığı qeyd edilir. Həmin kitabxanadan istifadə edən Əbu Təmman bu kitabxananın Əbu əl-Vəfaya aid olduğunu və kitablar arasında Xətib Təbrizinin 300 ərəb şairin əsərlərindən bəhs edən «əl-Həmasə» əsərinin də yer aldığını bildirir [Kazımi P. 2008, s. 13].

Yaqut əl-Həməvi Gəncənin kitablar xəzinəsi olan məşhur kitabxanasından söz edir. Ona görə, «Ərəb və fars dillərində zəngin kitab fondlarından biri də Azərbaycan şəhərlərindən olan Gəncədə yerləşmişdir. Belə kitab fondları olan kitabxanalar arzu edənlər üçün açıq olur-du. Bura gələnlər qiraət və kitabların üzünü köçürməklə məşğul olurdular. Kənardan gələnlərə mürəkkəb və qələm verirdilər, elmin müxtəlif sahələrində işləyən alimlər isə maaşla təmin olunurdu. Belə ki, kitabxanalarda məşhur alimlər iştirak edir, onların elmi mübahisələri təşkil edilirdi» [Əliyeva N., s. 68]. Oxşar kitab-xanalar Şamaxıda, Təbrizdə və digər şəhərlərdə də mövcud idi.

Səlcuqlar dövlətinin də paytaxtı olan Həmədanda Toğruliyyə adlı mədrəsənin böyük bir kitabxanasının olduğu qeyd edilir. P.Kazıminin verdiyi məlumata görə, «Səlcuqlar və ərəb xəlifələri Həmədanda ali məktəb və məscidlər tikdirmişdilər. Toğrul və Fəxrəddin Ərəbşah bu məktəblərdə işləyən alimlərə böyük hörmət bəsləyir, onların xahişlərini məmnuniyyətlə yerinə yetirirdilər. Toğrul həmin alim və şagirdlərin xatirinə Həmədanda böyük bir mədrəsə tikdirmiş və ona Toğruliyyə adını vermişdi. O, burada zəngin kitabxana da təsis etdirmişdi» [Kazımi P., s. 17].

Marağa rəsədxanası üçün Bağdad, Şam və Əl-Cəzirədən (Şimali İraqın bir hissəsi) ümumilikdə 400 min kitab toplanmışdı [Köprülü F. s. 222]. Rəsədxanaya rəhbərlik edən Nəsrəddin Tusi özü kitab toplamaq üçün iki dəfə İraq və Bağdada səfər etmişdi [Köprülü F., s. 223].

Elxanilər dövründə inşa olunan Rəbi-Rəşidi vəqfiyyəsində xüsusi bir kitabxana yaradılmış, buraya *«Beyt əl-kutub»* adı verilmişdi. Kitabxana mütəvəlli evinin (idarəçilərin) yaxınlığında yerləşirdi. Kitabxa-nanın idarəçiliyi də birbaşa vəqfi idarə edənlərə bağlı idi. Kitabxanada bir kitabxanaçı və bir də «münavil» xidmət göstərirdi. Arzu edən kitabın qiyməti qədər pulu kitabxanaya əmanət edərək onu bir aylığına evinə apara və ya üzünü köçürüb geri qaytara bilərdi. Fəzlullah Rəşidəddinin qələmə aldığı əsərlərin çoxu da həmin kitabxanada qorunurdu. Vəqf dəftərlərində kitabxananın xüsusi kataloqunun olduğu, hər cür oğurluq hadisəsinə qarşı kitabların xüsusi möhürlərlə möhürləndiyi qeyd edilir. Rəbi-Rəşidi kitab-

xanasında 60 min kitabın olduğu bildirilir [Richard F. 1361, s. 343-346; Özgüdenli O.G., s. 231].

Səlcuqlar dövründə Sultan Səncərin şərabdarı olan zəncanlı Əzizəddin Əbu Bəkir əz-Zəncaninin öz adına yaratdığı Əziziyyə kitabxanasında 12 min cild kitab saxlanılırdı [Erünsal İ. 2003, cilt 27, s. 19].

Qaraqoyunlular, Ağqoyunlular və Səfəvilər dövründə də böyük kitabxanaların və kitabxana mədəniyyətinin olduğundan bəhs edilir. P.Kazıminin verdiyi məlumata görə, «Ağqoyunlular və Qaraqoyunlular dövründə Azərbaycanda bir sıra kitabxanalar yaradılmışdır. XIV-XV əsrlərdə yaşayan hökmdarların əksəriyyəti saray kitabxanaları təşkil edirdilər. Bu kitabxanalardan Cahanşah kitabxanası, Uzun Həsən kitabxanası, Sultan Xəlil kitabxanası və Sultan Yaqub kitabxanasını qeyd etmək olar. Təbrizdə Nəsriyyə məktəbinin, Həmzə Bəy Ağqoyunlu məktəbinin kitabxanası da fəaliyyət göstərməkdə idi» [Kazımi P., s.31].

Şah İsmayıl və Şah Təhmasib dövründə Müzəffəriyyə kitabxanasından bəhs edilir. Bu hökmdarların vaxtında həmin kitabxananın rəisi əvvəl şair İsmayıl Kəmal, daha sonra isə Əmir Fəsih olmuşdur [Kazımi, s. 32]. Ərdəbildəki Şeyx Səfi məqbərəsinin də kitabxanasının olduğu və bu kitabxananın ruslar tərəfindən qarət edildiyi bildirilir [Özgüdenli O.G. 2006, s. 275-288].

## İcazətnamələr (diplomlar)

Lüğəti mənası «izn vermək» olan icazətnamə ali təhsil haqqında sənəd olan «diplom» mənasında işlədilir. Orta əsrlər təhsil sistemində təhsil müəssisələrindən məzun olanlara tələbənin elmi səviyyəsini, dərəcəsini və ixtisasını göstərən diplomlar verilirdi. Belə diplomlarda tələbənin adı və künyəsinin göstərilməsi vacib idi. Eyni sənəddə tələbənin baş müəllimi və müəllimlərinin adları da yazılırdı. İcazətnamələrdə hər zaman elmin əhəmiyyətinə toxunulur, burada Qurandan və hədislərdən sitatlar gətirilərək elmin insan üçün qiyməti və dəyəri vurğulanırdı. Misal üçün, diplomlarda Bəqərə surəsindən «Allah Adəmə bütün elmləri öyrətdi» ayəsi (Bəqərə-31) əks olunurdu.

Ümumiyyətlə, icazətnamələrin tərtibatı belə idi: Allahın tərifi; Həzrət Peyğəmbərin və əshabının tərifi; Elmin tərifi; İcazətin əhəmiyyəti; Tələbə və müəllimlərin adları; Oxudulan kitabların və öyrənilən elmlərin adları; Elm adamlarının Adəmə qədər uzanan nəsil silsiləsi; Vəfa (Burada müəllimlər tələbənin onları unutmamasını və adlarının dualarla zikr edilməsini xahiş edərdilər); Məzun olan tələbəyə müəllimlik tövsiyəsi; İmza, tarix və möhür.[16]

## Nəticə

Orta əsrlərdə Azərbaycan təhsil sistemi geniş sosial-mədəni-ticari şəbəkənin bir parçası idi. Yuxarıda başlıqlar altında təhlil etdiyimiz təhsillə bağlı məsələlərin hər birinin ticari və sosial tərəflərinin olduğunu nəzərə almalıyıq. Belə ki, təhsil sistemi kitab, cildçilik, dəriçilik, mürəkkəb, qələm və qələmdan, kağız və s. ticarət sahələrinin də inkişafına təsir edirdi. Bununla yanaşı, cildçilik, *təzyinat,* xəttatlıq, qələmdanlıq kimi sənətlərin yaranmasında və inkişafında təhsil əsas meyar olmuşdur.

Orta əsrlərdə Azərbaycanın təhsil anlayışı böyük bir coğrafiyanı əhatə edən təhsil sisteminin bir parçası olub, XI əsrdən XVII əsrə qədər həmin təhsil sisteminin mərkəzi rolunu oynamışdır.

[16] Təəssüflər olsun ki, əlimizdə sadəcə Osmanlıların son dövrünə aid icazətnamələr mövcuddur. Həmin icazətnamələrdən biri Türkiyə Respublikası Manisa İl Kitabxanası, N: 1004-8b-də qorunur.

### İstifadə edilmiş ədəbiyyat


1. Amar Z., *«The Revolution in Textiles in Eretz İsrael and Syria in the Middle Ages»,* Cathedra 87 (1998).
2. Anameriç Hakan, Rukancı Fatih, *«XI. – XVI. Yüzyıllar Arasında Medrese ve Universitelerde Eğitim»,* Tarih İncelemeleri Dergisi, cilt XXIII, sayı 2, Aralık 2008.
3. Bilge Mustafa, *İlk Osmanlı Medreseleri,* İstanbul: İstanbul Üniversitesi Edebiyat Fakultesi Yayınları, 1984.
4. Brockelmann Carl, *Geschichte der arabischen Literatur (GAL), Zeyl (supplement), Leiden: E.J.Brill, 1937-1942,* band. I.
5. Browne Edward G., *A Descriotive Catalogue of the Oriental Mss. Belonging to the Late E.G.Browne.* ed. Reynold A.Nicholcon, Cambridge 1932.
6. Çelebi Ahmet, *İslamda Eğitim Öğretim Tarihi,* Çeviren Ali Yıldırım, İstanbul: Damla Yayınevi, 2013.
7. En-Nedim Muhammed ibn İshak, *el-Fihrist,* Tercüme: Mehmet Yolcu, Sabri Türkmen, M.Salih Arı, Selahettin Polatoğlu, Furkan Halit Yolcu, Ankara: Cıra Yayınları, 2017.
8. Erünsal İsmail E., *Kütüphane,* DİA, 2003, cilt 27.
9. Eshenkulova Kishimjan, *Timurlular Devri Medrese Eğitimi ve Ulum el-Eva`il (Matematik, Astronomia ve Tıp),* İstanbul Üniversitesi Sosyal Bilimler Enstitüsü Yüksek Lisans Tezi, İstanbul 2001.
10. Əliyeva Nərgiz, *Əs-Səmaninin «Kitab əl-Ənsab» əsəri Azərbaycan mədəniyyət tarixinə dair mənbə kimi,* Bakı: Şərq-Qərb nəşriyyatı, 2010.
11. Əliyeva Nərgiz, *İbn Makula Azərbacyanlı ziyalılar haqqında,* Bakı, AMEA Tarix İnstitutu, 2014.
12. Əliyeva Nərgiz, *Orta əsrlərdə Azərbaycan alimlərinin elmi əlaqələri və tədris fəaliyyətləri,* Bakı: AMEA A.A.Bakıxaov adına Tarix İnstitutu, 2015.
13. Fayda Mustafa, *Taberi,* DİA, 2010, c. 39.
14. Hinz W., *İslamische Mass und Gewichte,* Leiden 1955.
15. İbn Havkal, *10.Asırda İslam Coğrafyası (Surat el-Arz),* Çeviren Ramazan Şeşen, İstanbul:Yeditepe Yayınları, 2014.
16. İbn Xəllikan Əhməd ibn Məhəmməd, *Vefayat əl-ayan və ənbai əbnai-z-zaman,* Məhəmməd Muhiyiddin Əbdülhəmid nəşri, Qahirə: əs-Saadə mətbəəsi, 1948-1949, cild-VI.
17. İzgi Cevat, *Osmanlı Medreselerinde İlim II,* İstanbul: İz Yayınları, 1997.
18. Kaymaz N., *Pervae Muinüddin Süleyman,* Ankara: Ankara Üniversitesi Dil ve Tarih Coğrafya Fakultesi Yayınları, 1970.
19 Kazımi Pərviz, *Səfəvilər dövründə Azərbaycanda kitabxana işi,* Bakı: Bakı Universiteti nəşriyyatı, 2008.
20. Keleş Mahmud Resep, *«Ortaçağ İslam Dünyasında Medreselerde Açılış Dersi Geleneği: Kayseri Pervane Bey Medresesi Örneği»,* Humanitas, 2016, 4 (8).
21. Keykavus, *Kabusname,* Hazırlayan S.Ç.Ekinci, İstanbul 2003.
22. Kıfti Cəmaləddin Əbil-hasən Əli ibn əl-Kadi əl-Əşrəf Yusif, *Əxbar əl-uləma bi əxbar əl-hükəma,* Leipzig 1903.
23. Köprülü Fuad, *«XIII. Asırda ,Marağa Rasathanesi Hakkında Bazı Notlar»,* TTK Belelen, cilt VI, sayı 23-24, 1942.
24. Makdisi George, *İslam`ın Klasik Çağında ve Hıristiyan Batı`da Beşeri Bilimler,* Tercüme Hasan Tuncay Başoğlu, İstanbul: Klasik Yayınları, 2007.
25. Mazaheri Ali, *Ortaçağda müslümanların yaşayışları,* Çeviren Bahriye Üçok, İstanbul: Varlık Yayınevi, 1972.
26. Mehmed S., *Büyük Selçuklu Dönemi İslam Hukuku,* Uludağ Üniversitesi Sosyal Bilimler Enstitüsü Yüksek Lisans Tezi, Bursa 2014.
27. Nəcəf Əkbər N., *Aran Atabəyləri,* Bakı: Başla nəşriyat, 2017.
28. Nəcəf Əkbər N., *Səlcuqlu dövlətləri və atabəyləri tarixi,* Bakı: «Qanun» nəşriyyatı, 2010.
29. Nizamülmülk, *Siyasetname,* Hazırlayan Mehmet Altay Köymen, Ankara: TTK Yayınları, 1999.
30. Özgüdenli Osman G., *İncu,* DİA (Diyanet İşleri Bakanlığı İslam Ansiklopediyası), c. XII.

31. Özgüdenli Osman G., *«Bir İlhanlı Şehir Modeli: Rab`i-Reşidi`de Meslekler, Görevliler ve Ücretler», Turco-İranica: Ortaçağ Türk-İran Tarihi Araştırmaları,* İstanbul: Kaknüs Yayınları, 2006 kitabı içində.
32. Özgüdenli Osman G., *«Bir İlhanlı Şehir Modeli: Rab-i Reşidi`de Meslekler, Görevliler ve Ücretler»,* Osmanlı Öncesi ile Osmanlı ve Cumhuriyet Dönemlerinde Esnaf ve Ekonomi Semineri, 9-10 Mayıs 2002, İstanbul, 2003, I.
33. Özgüdenli Osman G., *«XIV. Yüzyıl Başlarında Tebriz`de İki Yetimhane»,* Bax: *Savaş Çocukları, Öksüzler ve Yetimler,* editörler Emine Gürsoy Naskali ve Aylin Koş, İstanbul: Kitabevi Yayınları, 2003 kitabı içində.
34. Özgüdenli Osman G., *«Şeyh Safiu`d-din Erdebili`nin Türbesinde Bulunan Kitaölar», Turco-İranica: Ortaçağ Türk-İran Tarihi Araştırmaları,* İstanbul: Kaknüs Yayınları, 2006 kitabı içində.
35. Özgüdenli Osman G., *Meraga,* DİA, 2004, cilt 29.
36. Raşideddin Fəzlullah-i Hemedani, *Tarixi-mübarəki-Qazani (Geschichte Gazan-Hans aus dem Ta`tih-i Mubarek-i Gazani des Resid al-Din Fadlallah b. İmad al-Daula Abu`l-Hair),* transl. and ed. Karl Jahn, London, 1940.
37. Richard F., *«Möhr-i kitabxanə-yi Rəşidüddin Fəzlullahi-Həmədani»,* Ayəndə, VIII/6, Tehran 1361.
38. Subki, *Tabakat əs-safi`yyət əl-kübra,* Qahirə 1323-1324, c. III.
39. *Vəqifnamə-yi Rəbi-Rəşidi,* Müştəba Ninovi və İrəc Əfşar nəşri, Tehran 1350 hş.
40. Zəkəriyyə Qəzvini, *Asar əl-bilad,* Beyrut, 1370.